# Ön söz

əmd və sənalar Allaha məxsusdur. Sonuncu peyğəmbər Məhəmmədə, onun ailəsinə və bütün əshabələrinə Allahın salavatı və salamı olsun!

Hörmətli müsəlman qardaşım! Bu risalə, əsrimizin dahi alimi, yüzlərlə elmi fitvanın və möhtəşəm əsərlərin müəllifi, on minlərlə hədisin üzərində misilsiz elmi tədqiqatlar aparmış hədis mütəxəssisi, sünnəyə sarılmağı ilə zəmanəsinin sələfinə sarsılmaz arxa olmuş hörmətli şeyx Məhəmməd Nasiruddin Əl-Əlbaninin *(Allah onun qəbrini nurla doldursun)* İslam ümmətinə verdiyi dəyərli nəsihətlərdən bəhs edir. O, müsəlman dəvətçilərini hər şeydən öncə tovhidə diqqət yetirməyə çağırır və məsələ ilə əlaqədar yol verdikləri səhvləri onlara başa salır. Hörmətli şeyx əl-Əlbani, İslam təbliğatçılarına özlərinin dəvətini Məhəmməd peyğəmbərin *(ona və ailəsinə Allahın salavatı və salamı olsun)* həyata keçirdiyi "saflaşdırma və tərbiyə etmə" prinsipi üzrə qurmağı tövsiyə edir. O, yalnız bu halda ümmətimizin hal-hazırkı acınacaqlı vəziyyətinə son qoyulacağını və yer üzündə haqq-ədalətin bərqərar olacağını bildirir. Risalədə şeyx əl-Əlbani hər bir müsəlmanı öz etiqadında, dilində və əməlində düzgün olmağa və bu düzgünlüyün də Allahın haqlarından başladığını vurğulayır. O bildirir ki, biz Quranı və Məhəmməd peyğəmbərin *(ona və ailəsinə Allahın salavatı və salamı olsun)* hədislərini Allahın "Ey iman gətirənlər" deyə çağırdığı, razı qaldığı, Cənnətlə müjdələdiyi və bəziləri haqda hətta xüsusi ayələr nazil etdiyi səhabələr kimi dərk etməliyik. Çünki, məhz belə bir fəhmə yiyələndikdən

sonra müsəlmanlar vahid əqidəyə yiyələnəcəklər. Səhabələrin yolunu davam etdirmək ümmətin hər bir fərdi üçün şərəfdir.

Möhtərəm şeyx Məhəmməd əl-Əlbani İslama dəvət adı altında Qurana, Peyğəmbərin *(ona və ailəsinə Allahın salavatı və salamı olsun)* hədislərinə və birinciləri səhabələr olmuş saleh sələflərin fəhminə zidd təbliğat aparan Bidəti əhlini kəskin tənqid edərək onların iç üzünü ifşa etmişdir. O, özlərini müfti, alim, şeyx, doktor və sairə kimi avam kütləyə təqdim edən bu təbliğatçıların elmi səviyyəcə Məhəmməd peyğəmbərin *(ona və ailəsinə Allahın salavatı və salamı olsun)* cəmiyyətində yetişmiş ən sıravi müsəlmanla müqayisə edilə bilməyəcəyini sübuta yetirmiş və buna səbəbi onların ya düzgün tərbiyə almamasında ya da batil bir əqidəyə qulluq etmələrində görmüşdür. Bütün bunları oxuduqdan sonra insanı dəhşət bürüyür ki, sübhənallah əgər onların savadlıları əqidə məsələsində bu səviyyədədirsə, gör arxaları ilə gedən kəslərin vəziyyəti nə yerdədir?!

Axı siğədən başı açılmayan müctəhidin hər zaman, hər yerdə Kərbala və s. sözünü vacib bir təsdiq, Yezid tərəfdarlarına ölüm və s. sözünü isə zəruri bir inkar kimi etiqad edən rafizi, İslama kimi və necə dəvət etsin?! Yazıq artıq başını o qədər itirib ki, xeyirdə də yas saxlayır. Az qala bütün yer üzünü dolaşıb amma hələ də Yezidin nə özünü, nə də qohum-əqrabasını tapa bilməyib. Bəs yəqinlik dərəcəsinə çatdığını və bununla da şəriət hökmlərindən, namazdan, orucdan və s. azad olduğunu iddia edən şeyxinin pirləri və sairəni təsdiqləmək müsəlman olmaq üçün zəruri, onların inkarı isə küfrdür sözlərinə səhərdən axşama kimi “hu hu” demək öyrədilən sifi, İslama kimi və necə dəvət etsin? Tövhiddən bir əsər belə

yazmayan və ya şərh etməyən Seyyid Qutbu ("İxvanul-muslimin" partiyasının təsisçisi), qədim sələflərin əqidə kitabları əsrimiz üçün yararsızdır sözlərini söyləyən Məhəmməd Sururu ("Sururi" hizbinin başçısı), xəlifəyə beyət etmədən ölən cahiliyyə ölümü ilə ölüb hədisinə əsaslanaraq insanları kafir sayan lakin özü belə "arzusunda" olduğu xəlifəti qura bilməyən və xəlifəyə beyət etmədən ölən Təqiyyəddin Nəbhanini ("Hizbut-təhrir" partiyasının lideri) və s. bu kimi siyasətçiləri özünə şeyx, alim, rəhbər sayan, onlardan böyük həvəslə müsəlmanları kafir saymağı, qanlarını tökməyi, namuslarına toxunmağı, ölkələrini viran qoymağı və başqa saydıqca qurtarmayan vəhşilikləri öyrənən hizbiçi, İslama kimi və nə cür dəvət etsin?

Uca Allah müsəlmanların səflərini belə saxta dəvətçilərdən və onların havadarlarından təmizləsin! Amin!

Abu Abdurrahmən Sələfi

***Rəhimli və Mərhəmətli Allahın adı ilə***

***Müqəddimə***

Həqiqətən həmd Allaha məxsusdur. Biz Ona həmd edir, Ondan yardım və günahlarımızın bağışlamasını diləyirik. Nəfslərimizin şərindən və pis əməllərimizdən Allaha sığınırıq.

Allahın doğru yola yönəltdiyi kimsəni azdıran, azdırdığı kimsəni isə doğru yola yönəldən tapılmaz.

Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur. O, təkdir və şəriki yoxdur. Mən şahidlik edirəm ki, Məhəmməd Onun qulu və elçisidir.

***"Ey iman gətirənlər! Allahdan layiqincə qorxun. Yalnız müsəlman olduğunuz halda (**müsəlman kimi**) ölün!"*** (Ali-Imran,102)

***"Ey insanlar! Sizi tək bir şəxsdən (**Adəmdən**) xəlq edən, ondan zövcəsini (**Həvvanı**) yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun! (**Adı ilə**) bir-birinizdən (**cürbəcür şeylər**) istədiyiniz Allahdan, həmçinin qohumluq əlaqələrini kəsməkdən həzər edin! Şübhəsiz ki, Allah sizin üzərinizdə gözətçidir!"***(ən-Nisa,1)

***"Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz söyləyin! (**Əgər belə etsəniz, Allah**) əməllərinizi islah edər və günahlarınızı bağışlayar. Hər kəs Allaha və Peyğəmbərinə itaət etsə, böyük bir səadətə (**Cənnətə**) nail olar."*** (əl-Əhzab,70-71)

Hamı üçün çox faydalı və xeyirli olan bu risalədə[1] əsrimizin görkəmli çağdaş alimlərdən biri, möhtərəm şeyx Məhəmməd Nasiruddin əl-Əlbani *(Allah ona rəhmət etsin)* aktual bir sualı cavablandırmışdır. Dinin qeyrətini və dərdini çəkənlərin ürəklərində

[1] Bu risalə, kasetdən köçürülərək yazıya alınmış və sonradan 1419-cu hicri ilində "əs-Sələfiyyə" jurnalının dördüncü sayında dərc olunmuşdur.

daşıdıqları, gecə-gündüz ətrafında fikir mübadiləsi apardıqları və dillərindən düşürmədikləri bu sualın məğzi belədir: ***"Müsəlmanların dirçəliş yolu nədədir? Allahın onları möhkəmləndirməsi və ümmətlər arasında layiqli yerə qaldırması üçün nə etmək lazımdır?"***

Möhtərəm şeyx əl-Əlbani (*Allah ona rəhmət etsin*) həmin sualı geniş və aydın şəkildə cavablandırmışdır. Ona böyük ehtiyac duyulduğunu görərək çapa hazırlamaq qərarına gəldik. Uca Allahdan bu risalənin müsəlmanlar üçün faydalı olmasını və onları sevib razı qaldığı əməllərə yönəltməsini diləyirəm. Həqiqətən O, kəramət və səxavət Sahibidir.

***Ey İslam təbliğatçıları, tövhid hər şeydən öncədir!***

Sual: Möhtərəm şeyx, şübhə yoxdur ki, İslam ümmətinin dini durumunun acınacaqlı olmasından xəbərdarsınız. Buna misal olaraq etiqad və inanc məsələlərində savadsızlığı, təbliğat metodlarında fikir ayrılığını, İslama çağırışın yer üzünün əksər hissəsində ilk insanların metod və əqidəsinə uyğun şəkildə aparılmadığını göstərmək olar. Halbuki ümmətin əvvəli məhz bu yolla islah olmuşdur. Bu acınacaqlı vəziyyət İslama sadiq insanlarda mövcud olan nöqsanları aradan qaldırmaq və onlara düzəlişlər etmək istəyi doğursa da, etiqad və yanaşma metodu baxımından ziddiyyətlərin olması, bu şəxslərin islah yollarının ayrılmasına gətirib çıxarmışdır. Bildiyiniz kimi, on illər boyu ümməti islah etmək iddiasında olan çoxsaylı İslam hərəkatlarının və cərəyanlarının olmasına baxmayaraq, onlar hər hansı uğur və nəticə əldə etməmiş, əksinə, ümmətin başına yeni fitnələr, fəlakətlər və dəhşətli müsibətlər gətirmişlər. Buna səbəb isə onların metod və əqidələrinin Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun*) əmrinə və Allahın ona nazil etdiyi dinə zidd olmasıdır. Bütün bunların, öz növbəsində müsəlmanların, xüsusilə də onlardan gənclərin bu problemlərin həlli yolunda çaşıb qalmalarına böyük təsiri olmuşdur. Buna görə də özünü peyğəmbər metodunun və möminlərin yəni, əshabə və onların gözəl şəkildə davamçıları olan İslam alimlərinin (fəhm) ardıcılı hesab edən müsəlman dəvətçi, bu vəziyyəti, onu islah etməyi və bu işdə başqaları ilə əlaqə və münasibətlərin qurulmasında üstünə düşən böyük məsuliyyəti dərk etməlidir.

***Bu hərəkat və cərəyanların ardıcıllarına məsləhətiniz nədir?***

***Bu durumdan çıxış yolu nədədir?***

***Müsəlman öz vəzifə borcünü necə yerinə yetirməlidir ki, Qiyamət günü Allah dərgahında cavab verə bilsin?***



***avab: Peyğəmbərlər və elçilər*** *(onlara Allahın salamı olsun)* ***kimi hər şeydən əvvəl tövhidə diqqət və qayğını artırmaq lazımdır.***

Yuxardakı sualda qeyd edilən müsəlmanların vəziyyətinin ağırlığına əlavə olaraq demək istərdim ki, bugünkü acınacaqlı hal, ərəblərin İslamdan öncəki, Peyğəmbərimiz Məhəmməd (*ona Allahın salavatı və salamı olsun*) göndərilməmişdən əvvəlki vəziyyətdən daha kədərli deyildir. Belə ki, aramızda kamil din və onunla insanları doğru yola yönəldən, onlara etiqat, ibadət, tərbiyə və metod baxımından həqiqi İslamı təbliğ edən, haqq yolda olan bir toplum mövcuddur. Şübhə yoxdur ki, bir çox müsəlman cəmiyyətlərinin bugünkü halı Cahiliyyət dövründəki ərəblərin halına bənzəyir.

Buna əsasən deməliyəm ki, müalicə həmin müalicə, dərman da həmin dərman olmalıdır. Bu gün bütün İslam dəvətçiləri, Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun*) İslamdan əvvəlki dövrü müalicə etdiyi metodla, "Lə iləhə illəllah" kəlməsinin yanlış anlaşılması ilə bağlı olan bu acınacaqlı vəziyyəti eyni cür dava-dərmanla müalicə etməlidirlər. İzzət və cəlal sahibi Allahın: ***"Həqiqətən, Allahın Rəsulu Allaha, qiyamət gününə ümid bəsləyənlər (****Allahdan, qiyamət günündən qorxanlar****) və Allahı çox zikr edənlər üçün gözəl örnəkdir!"*** (əl-Əhzab:21) ayəsi barədə dərindən düşünsək onun bu mənanı daşıdığını açıq-aydın görə bilərik.

Peyğəmbərimiz (*ona Allahın salavatı və salamı olsun*) müsəlmanların problemlərinin həlli yolunda hər zaman olduğu kimi, əsrimizdə də gözəl örnəkdir. Bu da bizdən Peyğəmbərin (*ona Allahın*

*salavatı və salamı olsun*) başladığı kimi başlamağımızı, yəni ilk növbədə müsəlmanların korlanmış etiqadını, sonra ibadətini, daha sonra isə tərbiyələrini islah etməyimizi tələb edir. Qeyd etdiyim ardıcıllıqdan məqsədim birinci məsələni o birilərindən ayırmaq deyil, müsəlmanların bu işə daha çox əhəmiyyət verməlidir. Müsəlmanlar dedikdə, təbii ki, İslam təbliğatçılarını, daha doğrusu isə, onlardan alim olanlarını nəzərdə tuturam. Təəssüflər olsun ki, günümüzdə, elmi səviyyəsindən asılı olmayaraq hər bir müsəlman özünü İslam təbliğatçısı hesab edir. Nəticə etibarı ilə hamı bu anlayışa daxil olmuşdur. Elə burada nəinki alimlərin hətta ağıl sahiblərinin bildiyi bir məşhur məsəli xatırlatmaq istərdim: "***İnsan itirdiyi bir şeyi kiməsə verə bilməz***".

Bildiyimiz kimi bu gün milyonlarla tərəfdarı olan çox böyük bir təriqət var ki, təbliğatçı dedikdə də insanlar ilk öncə onları nəzərdə tuturlar. Həmin adamlar "Dəvət camaatı" və ya "Təbliğat camaatı" - deyə tanınırlar. Bununla belə uca Allahın buyurduğu kimi: ***"Lakin insanların əksəriyyəti bilməz!"*** (əl-Əraf: 187).[1]

Məlumdur ki, onlar təbliğat metodikasında az öncə qeyd etdiyim birinci əsasdan və ya ən əhmiyyətli işdən yəni əqidə, ibadət və təlim-tərbiyə işlərindən tam şəkildə üz döndərmiş, bununla da nəinki Peyğəmbərimizin (*ona Allahın salavatı və salamı olsun*), hətta bütün peyğəmbərlərin başladıqları islah yolundan üz çevirmişlər. Uca Allah ***"Biz hər ümmətə: "Allaha ibadət edin, tağutdan çəkinin! – deyə peyğəmbər göndərmişdik."*** (ən-Nəhl: 36) ayəsində bunu açıqlamışdır. Həmin təriqət sahiblərinin İslamda ən mühüm sayılan bu əsasa, onun birinci dayağına diqqət yetirmədiyi isə, hər bir müsəlmana bəllidir. Kəramətli peyğəmbərlərin ilki olan Nuh *(ona Allahın salavatı və salamı olsun)* min ilə yaxın bir müddətdə bu əsasa dəvət etmişdir. Məlum olduğu kimi dinimizdə ibadət və qarşılıqlı

[1] Yəni, təriqət tərəfdarlarının əksəriyyəti elmsizdirlər - redaktor F.S.

münasibətlərlə bağlı hökmlərə verilən açıqlamalar əvvəlki şəriətlərdə yox idi. Buna səbəb İslamın bütün dinlərin və şəriətlərin sonuncusu olması idi. Nuh peyğəmbərin (*ona Allahın salamı olsun*) doqquz yüz əlli il vaxtını və diqqətini öz xalqını tövhidə çağırmağa sərf etməsinə baxmayaraq onun xalqı bu dəvətdən üz döndərmişdir. Uca Allah bu hadisəni Quranda belə açıqlayır: ***"Və (****tabeçiliyində olanlara****) dedilər: "Öz tanrılarınızı tərk etməyin, (****xüsusilə****) Vəddi, Suvaı, Yəğusu, Yəuqu və Nəsri atmayın!""*** (Nuh,23)

Bu ayə, "Həqiqi İslama" təbliğat aparanların daima əhəmiyyət verəcəkləri ən vacib məsələnin tövhidə çağırış olmasına açıq-aydın dəlildir. Uca və Pak Allahın: ***"Bil ki, Allahdan başqa heç bir tanrı yoxdur."*** (Məhəmməd,19) ayəsinin mənası da bu məsələyə dəlildir.

Peyğəmbərimizin *(ona Allahın salavatı və salamı olsun)* əməl etdiyi və öyrətdiyi yol məhz belə olmuşdur. Əməlinə gəlincə, bu haqda araşdırma aparmağa ehtiyac yoxdur. Çünki, Məkkə dövründə Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun*) işinin və təbliğatının əsas hissəsini xalqı şəriki olmayan Allaha ibadət etməyə çağırış təşkil edirdi.

Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun*) təliminə gəldikdə isə, Buxari və Müslimin Ənəs ibn Malikdən *(Allah ondan razı olsun)* rəvayət etdikləri hədisdə buyrulur: "***Peyğəmbər*** *(ona Allahın salavatı və salamı olsun)* ***Müazı Yəmənə göndərərkən ona demişdi: "Onları ən birinci şəhadət kəlməsinə dəvət et! Əgər bu işdə sənə tabe olsalar ....***""[1]. İnşallah bu məlum və məşhur bir hədisdir.

Beləliklə, Peyğəmbər *(ona Allahın salavatı və salamı olsun)* səhabələrinə özünün başladığı tövhidə çağırışdan başlamağı əmr etmişdir.

[1] Hədis səhihdir. Onu Buxari (1395) bir neçə yerdə, Müslüm (19), Abu Davud (1584) və Tirmizi (625) Ibn Abbasdan -Allah ondan razı olsun- rəvayət etmişlər.

Şübhə yoxdur ki, öz dillərində deyilən sözü anlamaq baxımından Cahiliyyət dövründə yaşayan müşrik ərəblərlə bugünkü müsəlman ərəblərin əksəriyyəti arasında çox böyük fərq vardır. Belə ki, məzhəbindən, təriqətindən və əqidəsindən asılı olmayaraq hər bir müsəlman "Lə iləhə illəllah" dediyinə görə ona bu kəlməni söyləməsini təbliğ etməyə ehtiyac yoxdur. Həqiqətdə onun bu gözəl kəlmənin mənasını daha geniş şəkildə başa düşməyə ehtiyacı vardır. Bu, Cahiliyyət dövrünün müşrik ərəbləri ilə bugünkü ərəb müsəlmanlarının əksəriyyəti arasında nəzərə çarpan ciddi bir fərqdir. Qurani-Kərimdə açıqlandığı kimi[1] Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) o dövrün ərəblərini "Lə iləhə illəllah" söyləməyə çağırdıqda onlar bundan imtina etmişdilər. Sual doğurur ki, onların etirazlarına səbəb nə idi? Cavab, onlar bu sözün Allaha şərik qoşmamaq və Ondan başqasına ibadət etməmək mənasında olduğunu bilirdilər. Bununla yanaşı, Allahdan başqasına ibadət edir, nəzir deyir, təvəssül edir, Ondan qeyrisini köməyə çağırır, hakim seçir, qurban kəsir... və s. edirdilər.

Bu, müşriklərin məşhur şirk və bütpərəstlik vasitələri idi. Lakin eyni zamanda onlar, bu gözəl kəlmənin yəni, "Lə iləhə illəllah"ın ərəb dilində həmin işlərə zidd məna daşımasını və onun belə əməllərə son qoyulmasını ciddi şəkildə tələb etdiyini bilirdilər.

***Bu gün müsəlmanların əksəriyyəti "Lə iləhə illəllah"ın mənasını yaxşı bilmir.***


gün "Lə iləhə illəllah" şəhadəti verən müsəlmanların əksəriyyəti nəinki onun mənasını yaxşı bilmir, bəlkə də onu tamamilə əks şəkildə anlayırlar. Buna bir misal çəkmək

[1] əs-Saffət surəsinin 35 və 36-cı ayələrinə işarə edir: ***"Onlara: "Allahdan başqa heç bir tanrı yoxdur!" – deyildiyi zaman təkəbbür göstərirdilər. Və: Biz heç divanə bir şairdən ötrü tanrılarımızı tərk edərikmi?!" – deyirdilər."***

istəyərdim. Bir qisim insanlar[1] "Lə iləhə illəllah"ın mənası haqda kitab yazmış və onu "Allahdan başqa Allah (rəbb) yoxdur!" kimi şərh etmişlər. Həmin mənaya müşriklərin də iman gətirmələrinə baxmayaraq, bu onlara heç bir fayda verməmişdir. Uca Allah buyurmuşdur: ***"Həqiqətən, əgər sən (****müşriklərdən****): "Göyləri və yeri kim yaratmışdır?" – deyə soruşsan, onlar mütləq: "Allah!" – deyə cavab verəcəklər."*** (Loğman,25).

Müşriklər Allahın bütün varlıqları şəriksiz yaratdığına iman gətirsələr də ibadətlərində Ona ortaq qoşurdular. Onlar Allahın tək olmasına iman gətirsələr də məbudların[2] çox olduğuna da inanırdılar. Buna görə də Uca Allah "başqasına ibadət" adlandırdığı bu etiqadı rədd edərək buyurmuşdur: ***"Allahı qoyub başqalarını özlərinə dost tutanlar: "Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!" (****deyirlər****)."***(əz-Zumər,3).

Müşriklər "Lə iləhə illəllah" sözünün Allahdan başqasına ibadəti tərk etməyi tələb etdiyini anlayırdılar. Bugünkü müsəlmanların əksəriyyəti isə bu gözəl sözü yəni, "Lə iləhə illəllah"ı "Allahdan başqa Allah (rəbb) yoxdur" kimi izah edirlər. "Lə iləhə illəllah" deyib Allahdan başqasına ibadət edən müsəlman zahirən İslam yolunda olsa da etiqad baxımından müşriklərlə eynidir. Çünki o, "Lə iləhə illəllah" kəlməsini deyir və bununla da zahirən müsəlman sayılır. Bütün bunlar bir İslam təbliğatçısı kimi hər birimizdən insanları tövhidə çağırmağı və "Lə iləhə illəllah"ın mənasını bilməyən, ona zidd əməllər edən müsəlmanlara dəlilləri sübut etməyi tələb edir. Müşrik isə, "Lə iləhə illəllah" deməkdən imtina etdiyi üçün nə zahirən, nə də daxilən müsəlman sayılmır.

[1] Suriyada Sufiliyin "Şaziliyyə" qolunun əlli ildən bəri dini lideri sayılan şeyx Məhəmməd əl-Haşimini nəzərdə tutur.
[2] ilahların, ibadət olunanların (Ağamusa Axundof "Azərbaycan dilinin izahlı lüğəti" Bakı, "Elm" nəşriyyatı, 2005)-tərc.

Bugünkü müsəlmanların əksəriyyətinə gəlincə, onlar müsəlmandırlar. Çünki, Peyğəmbərimiz (*ona Allahın salavatı və salamı olsun*) buyurmuşdur: ***"Əgər onu (****Lə iləhə illəllahı****) desələr İslam haqları istisna olmaqla qan və mallarını məndən qorumuş olarlar. Onların hesabı isə Uca Allaha aiddir."***[1]

Buna görə də nadir hallarda işlətdiyim bir sözü demək istərdim. Bugünkü müsəlmanların bir çoxunun halı "Lə iləhə illəllah" kəlməsinin yanlış şəkildə anlanılması baxımından Cahiliyyat dövründəki ərəblərin halından daha pisdir. Çünki, müşrik ərəblər onu (mənası ilə) anlayır, lakin iman gətirmirdilər. Bugünkü müsəlmanların çoxu isə (qəlbləri ilə) etiqad etmədikləri sözləri söyləyirlər. Onlar "Lə iləhə illəllah" kəlməsini desələr də onun mənasına düzgün şəkildə iman gətirmirlər.[2] Buna görə də həqiqi müsəlman təbliğatçıları öz dəvətlərini hər şeydən öncə "Lə iləhə illəllah" ətrafında qurmalı, ilkin olaraq onun qısa mənasını, sonra isə qarşıya qoyduğu tələbləri yəni, bütün ibadətlərin yalnız Allah üçün yerinə yetirilməsini təfsilatlı şəkildə insanlara açıqlamalıdırlar. Çünki, İzzət və cəlal sahibi Allah, müşriklərin: ***"... Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!"*** (əz-Zumər,3) - demələrini xəbər verərkən Allahdan başqasına edilmiş hər bir ibadəti "Lə iləhə illəllah" kəlməsinə küfr (inkar) adlandırmışdır. Həmin səbəbdən də mən bu gün deyirəm ki, müsəlmanlara belə bir gözəl kəlmənin yəni, "Lə iləhə illəllah"ın mənasını izah etmədən öncə onları birləşdirib sonra da zəlalət içində tərk etməyin heç bir faydası

[1] Hədis səhihdir. Hədisi Buxari (25 və başqa yerlərdə), Müslim (22) və digərləri Ibn Ömərdən -Allah onların hər ikisindən razı olsun- rəvayət etmişlər.

[2] Qəbirlərə ibadət edir, Allahdan başqası üçün qurban kəsir və ölülərdən kömək diləyərək onlara dua edirdilər. Danılması mümkün olmayan bütün bu baş verənlər Rafizilərin, Sufilərin və digər təriqət sahiblərinin etiqad etdikləri əməllərdir. Qəbirlərin üzərində Allaha şərik qoşulan tikililər ucaltmaq və həmin yerləri ziyarətgaha çevirmək, orada dinə zidd əməllər etmək, saleh insanlardan yardım diləmək və onlara and içmək bu kimsələrin sabit əqidəsi sayılır.

yoxdur. Bunun onlara nəinki axirətdə, heç dünyada da xeyri olmayacaqdır! Biz, Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun*) : ***"Ölüm anında sidq ürəklə "Lə iləhə illəllah" deyənin bədənini Allah Cəhənnəmə haram buyurar"*** başqa rəvayətdə ***"Ölüm anında sidq ürəklə "Lə iləhə illəllah" deyən Cənnətə girər"*** hədisini bilirik[1]. Bu sözü sidqlə (səmimi qəlblə) deyən şəxs, çətinlik və əzaba düçar olsa da onun Cənnətə girməsinə zəmanət vermək olar. Bu kəlmə barədə doğru etiqada malik olan şəxs etdiyi pis əməl və günahlara görə əzaba düçar olsa belə onun son dönüş yeri Cənnət olacaqdır. Əks olaraq, kiminsə qəlbən iman gətirmədən bu gözəl kəlməni sadəcə dili ilə deməsi bəlkə də dünya həyatında onu döyüş və ya ölümdən qurtarsın, əgər hökmranlıq müsəlmanların əlində olarsa, lakin axirətdə bunun heç bir faydası olmayacaqdır. Bu söz axirətdə, onun mənasını anlayaraq deyən və həmin mənaya iman gətirən şəxsə fayda verəcək. Çünki, anlamaq yalnız iman gətirdikdə fayda verir. Bu kiçicik bir qeyddir. Lakin belə hesab edirəm ki, insanların əksəriyyəti bu qeyddən xəbərsizdirlər! Anlamaq, hələ iman gətirmək demək deyil. Mömin olmaq üçün bunların ikisi də (yəni, həm anlama, həm də iman gətirmə) bir yerdə olmalıdır. Belə ki, kitab əhlindən sayılan bir çox yəhudi və xristianlar Məhəmmədin (*ona Allahın salavatı və salamı olsun*) peyğəmbərlik və elçilik xəbərinin doğru olduğunu bilirdilər. Rəbbimiz, şahid olduğu bu bilgi haqda buyurmuşdur: ***"Kitab (****Tövrat və İncil****) verdiyimiz şəxslər onu (****Məhəmmədi****) öz oğullarını tanıdıqları kimi tanıyırlar."*** (Bəqərə,146) Bununla belə həmin elm onlara Allah dərgahında heç bir fayda vermədi. Bəs elə isə buna səbəb nə idi? Cavab, onlar Məhəmmədin peyğəmbərlik və elçilik iddiasını təsdiq etmədilər. Beləliklə, bilmək imandan öncə olsa

[1] Hədis səhihdir. Onu imam Əhməd (5/236) və İbn Hibban (4) rəvayət etmişdir. Əl-Əlbani "Səhih hədislər silsiləsində" hədisə səhih demişdir.

da, o tək yetərli deyildir. Əksinə, iman və itaətin onunla birgə olması zəruridir. İzzət və cəlal sahibi Allah, Qurani-Kərimdə buyurmuşdur: ***"Bil ki, Allahdan başqa heç bir tanrı yoxdur. (****Ondan****) öz günahlarının bağışlanmasını dilə ..."*** (Məhəmməd, 19).

Deməli, "Lə iləhə illəllah"ı dili ilə deyən müsəlman, gərək onun qısa, sonra da təfsilatlı mənasını bilsin. Elə az öncə qeyd etdiyim bəzi hədislər də, onu bilən, təsdiq edən və iman gətirən şəxsə aiddir. Belə hədislərdən birində Peyğəmbər, (*ona Allahın salavatı və salamı olsun*) haqqında danışdığım bu təfsilata işarə edərək buyurmuşdur: "***Kim "Lə iləhə illəllah" deyərsə, bir vaxt gələr bu ona fayda verər.***"[1]

Yəni, bu gözəl kəlmə onun mənasını bildikdən sonra insanı Cəhənnəmdə əbədi qalmaqdan xilas edir. Yadda qalsın deyə bir daha təkrar edirəm ki, ola bilər insan bu sözün saleh əməllər etmək və günahlardan çəkinmək kimi kamillik tələblərini yerinə yetirməsin. Lakin bununla yanaşı o, böyük şirkdən uzaq olsun, kəlmənin öhdəliklərinə cavab versin, imanın qəlb əməlləri, bəzi alimlərin rəyinə görə isə, həmçinin zahiri əməlləri ilə bağlı[2] şərtlərinə riayət etsin. Belə şəxsin aqibəti (yəni, cənnətlik və ya cəhənnəmlik olması) Allahın istəyindən asılıdır. Məsələnin təfsilatına gəlincə, bu başqa bir kitabın mövzusudur. Ola da bilər ki, həmin şəxs etdiyi böyük günahlara, asiliklərə və ya səhlənkar yanaşdığı vaciblərə görə cəzalandırılsın və Cəhənnəmə daxil edilsin. Lakin sonradan bu gözəl kəlmə onu xilas etsin, yaxud da Allah Öz fəzilət və kəraməti ilə onu

---

[1] Hədis səhihdir. əl-Əlbani "Səhih hədislər silsiləsi" kitabında (1932) onun səhih isnadlı olduğunu bildirmişdir. Əbu Səid əl-Ərabi isə "Möcəm" kitabında bu rəvayətin Əbu Nueymin "Hilyə" kitabında (5/46), ət-Təbəraninin "əl-Əvsat" kitabında (6533) Əbu Hureyradan -*Allah ondan razı olsun*- nəql edildiyini qeyd etmişdir.

[2] Saleh sələflərimizin bu əqidəsi, bizimlə Xavaric və Murciələr arasında ayrıcı bir həddir.

əfv etsin. Yuxarıda qeyd olunan: ***"Kim "Lə iləhə illəllah" deyərsə, bir vaxt gələr bu ona fayda verər."*** – hədisinin mənası da elə budur. Dili ilə "Lə iləhə illəllah"ı deyib, onun mənasını başa düşməyən və ya başa düşüb mənasına iman gətirməyən şəxsə gəlincə, həmin kəlmə, ona İslam hakimiyyəti altında (və ya müsəlmanlar arasında) yaşaması istisna edilməklə, nə bu dünyada, nə də axirətdə heç bir fayda verməyəcəkdir.

Buna görə də, müsəlman cəmiyyətini dirçəltmək və bütün yer üzündə Allahın buyurduqları ilə hökm edəcək İslam dövlətini qurmaq istəyində olan dini təriqətlər[1] və ya onların əksəri hamılıqla tövhidin təbliğini əsas götürülməli və onu doğru və sürətli şəkildə aparmalıdırlar. Onlar həmrəylik göstərdikləri bu məqsədlərini yalnız Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun*) başladığı üslubla həyata keçirə bilərlər.

***Etiqada diqqətin vacibliyi heç də şəriətin digər sahələri olan ibadət, əxlaq və qarşılıqlı münasibətlərə laqeydlik göstərmək demək deyildir.***

Bir daha nəzərinizə çatdırıram ki, mənim çox mühüm bir məsələyə dair verdiyim açıqlama, dəvətçilərin heç nəyə əhəmiyyət vermədən yalnız bu gözəl kəlməni və onun mənasını təbliğ etməsi demək deyildir. Çünki izzət və cəlal sahibi olan Allah, dinini digər hökmlərlə kamil edərək bizə olan nemətini tamamlamışdır. Əksinə, həmin dəvətçilər İslamı parçalamadan, tam şəkildə çatdırmalıdırlar. Yuxarıda verdiyim açıqlamanın xülasəsinə gəlincə, həqiqi İslam dəvətçiləri İslamın gətirdiyi ən mühüm məsələni, yəni "Lə iləhə illəllah" kimi gözəl bir kəlməyə əsaslanan

[1] Cərəyan, tayfa və camaatların- tərc.



doğru əqidəni müsəlmanlara anlatmalıdırlar. Diqqətinizi bir daha yuxarıdakı açıqlamaya yönəltmək istərdim. Burada məqsəd müsəlmanın yalnız "Lə iləhə illəllah"ın mənasının "***Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur***" olduğunu bilməsi deyildir. Həmçinin, onun izzət və cəlal sahibi Allaha ediləcək ibadətləri başa düşməsi və bu ibadətlərdən heç birini Uca Allahdan qeyrisinə etməməsidir. Bu təfsilatın mütləq şəkildə gözəl kəlməyə (yəni, "Lə iləhə illəllah"a) verilən qısa məna ilə yanaşı olması zəruridir. Zənnimcə belə məsələlərdə ümumi şəkildə verilən açıqlamalar kifayət etmir. Buna görə də mövzu ilə əlaqədar bir və ya bir neçə misal çəkmək çox gözəl olardı.

İbadətləri Allahdan başqasına aid etməməklə həqiqi müvahhid olan (yəni, tövhid prinsipini dəstəkləyən) müsəlmanların bir çoxu Quranda və Sünnədə qeyd olunmuş sağlam fikir və əqidədən xəbərsizdirlər. Bu şəxslərin əksəriyyəti əqidədən bəhs edən çoxsaylı ayələri və bəzi hədisləri oxumaqla onların məğzinə diqqət yetirmirlər. Baxmayaraq ki, belə ayə və hədislər izzət və cəlal sahibi olan Allaha imanı kamilləşdirir. Onlardan birini, məsələn iman mövzusundan sayılan Allahın yaratdıqlarından yüksəkdə olması məsələsini götürək. Şəxsi təcrübəmə əsaslanaraq deyirəm ki, müvahhid olan sələfi qardaşlarımızın bir çoxu bizimlə birgə yozum etmədən və keyfiyyətə varmadan uca Allahın ərşə yüksəldiyini etiqad edirlər. Lakin bununla yanaşı onlar, şübhəsini Quran ayəsinin zahirinə əsasən qurmuş hansısa bir müasir mötəzilə, cəhmi, matrudi və ya əşari[1] təriqətinin tərəfdarı ilə qarşılaşdıqda, əqidələrinin dürüstlüyü barədə tərəddüd edir və özlərini haqdan uzaq bir zəlalətə salırlar. Belə hallarda nə vəsvəsə edənin nə də vəsvəsə verilənin həmin ayənin məğzindən belə xəbəri olmur. Sual doğurur ki, buna

[1] Mötəzilə, cəhmiyyə, əşariyyə və matrudiyyə İslamın ilk əsrlərində meydana gəlmiş azğın dini cərəyanlardır – ixtisas red.

səbəb nədir? Cavab, o, doğru əqidəni İzzət və cəlal sahibi Rəbbimizin kitabında və Peyğəmbərimizin *(ona Allahın salavatı və salamı olsun)* hədislərində olduğu kimi hər tərəfli şəkildə öyrənməmişdir. Müasir mötəziləçi belə deyir: "İzzət və cəlal sahibi Allah buyurur: ***"Göydə olanın** (Allahın) **yer hərəkətə gəlib çalxalandığı zaman sizi onun dibinə batırmayacağına əminsinizmi?!"*** (əl-Mülk, 15-16). Siz də söyləyirsiz ki, Allah səmadadır. Bu, məbudunuzun (yəni, ibadət etdiyinizin – red.) müəyyən bir məkanda, yaradılmış səmada olduğu mənasına gəlir." Nəticə etibarı ilə o (yəni, müasir mötəziləçi), qarşısındakı şəxsi şübhəyə salmış olur.

***Sağlam əqidənin və onun tərkib hissələrinin bir çox insanlara aydın olmaması:***

Ötən misalı çəkməkdə məqsədim tövhid əqidəsinin bütünlüklə yəni, tərkib hissələri və tələbləri ilə birgə nəinki əşari, matrudi və cəhmi əqidəsində olanların, təəssüflər olsun ki, hətta bir çox sələfilərin zehnində aydın olmamasını açıqlamaqdır. Bununla demək istəyirəm ki, məsələ bu gün bizimlə yanaşı Quran və hədisi təbliğ edən bəzi dəvətçilərin iddia etdiyi kimi də asan deyildir. Buna səbəb, İslamdan əvvəlki müşriklərlə müasir müsəlmanların əksəriyyəti arasında qeyd etdiyim fərqin olmasıdır. Belə ki, İslamdan əvvəlki müşrikləri "Lə iləhə illəllah" deməyə çağırdıqda, onlar bu gözəl kəlmənin mənasını anladıqları üçün onu söyləməkdən imtina edirdilər. Bu günkü müsəlmanlar isə, bu kəlməni tələffüz etsələr də, onun həqiqi mənasını dərk etmirlər. Bu əsas fərq, əqidə mövzusu sayılan izzət və cəlal sahibi Allahın bütün yaratdıqları fövqündə olması məsələsində də mövcuddur. Halbuki, bu haqda müstəqil araşdırma aparılmasına ehtiyac vardır. Müsəlmanın, ***"Rəhman ərşə yüksəldi"*** (Tahə, 5) ayəsi ilə yanaşı "***Yerdəkilərə rəhm edin ki, göydəki***

***də sizə rəhm etsin***"[1] hədisindəki "fi" ön qoşmasının[2] (məkan bildirən) zərflik mənasını daşımasını etiqad etməsi düzgün deyildir. Hədisdə qeyd olunan ön qoşma, ***"Göydə olanın** (Allahın) **yer hərəkətə gəlib çalxalandığı zaman sizi onun dibinə batırmayacağına əminsinizmi?!"*** (əl-Mülk, 15-16) ayəsindəki ön qoşma ilə eyni məna daşıyır. Çünki buradakı "fi" ön qoşması "üzərində" (ərəbcə "alə") mənasını daşıyır. Buna dəlil isə həddindən artıq çoxdur. Misal olaraq insanların dilində məşhurlaşmış ötən hədisi göstərmək olar. Həmin rəvayət, onun nəql yollarının toplusu ilə səhih sayılır. Həmd sənalar Allaha məxsusdur. Peyğəmbərin *(ona Allahın salavatı və salamı olsun)* ***"Yerdəkilərə rəhm edin ..."*** buyruğunda torpağın içində yaşayan qurd və həşəratlar deyil, yer üzərində yaşayan insan və heyvanlar nəzərdə tutulur. Bu da, ***"... Göydəki də sizə rəhm etsin"*** ifadəsindəki "fi" ön qoşması ilə eyni yəni, səmanın üzərində mənasındadır. Haqqa dəvət çağırışını qəbul etmiş şəxslərin belə bir təfsilatdan xəbərdar olmaları zəruridir. Buna dair başqa bir misal "Qoyun otaran cariyənin" hədisidir. Hamının bildiyi bu məşhur hədisdə Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) ondan ***"Allah haradadır?"***- deyə soruşduqda o: ***"Səmadadır"***- deyə cavab vermişdir[3]. Cariyənin Allahın səmada olmasını söylədiyi və Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun*) də onu təsdiqlədiyi halda, əl-Əzhar universitetinin günümüzdə yaşayan böyük şeyxləri "Allah haradadır?" sualına "hər yerdə" deyə cavab verirlər. Nə üçün? Çünki o qadın, Allahın ona verdiyi fitri elmə əsaslanaraq cavab vermişdir.

[1] Hədis səhihdir. Onu Əbu Davud (4941) və Ət-Tirmizi (1925) rəvayət etmişdir. Əl-Əlbani "Səhih hədislər toplusu"(925) əsərində həmin rəvayətin səhih olduğunu bildirmişdir.

[2] Azərbaycan dilində -da, -də şəkilçisini bildirir. Burada məqsəd hədisdə buyurulan "göydəki" sözünün "göyün üzərindəki" mənasını daşımasıdır.

[3] Hədis səhihdir. Onu Müslim (537), Əbu Davud (930 və Nəsai (1/14-18) Müaviyə ibn əl-Həkəm əs-Süləımi adlı səhabədən -Allah ondan razı olsun- rəvayət etmişlər.

Müasir təbirlə desək, hər hansı bir pis mühitə qarışmayaraq ancaq sələfi mühitində yaşamışdır. Günümüzdə deyildiyi kimi, Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) məktəbinin yetirməsi idi. Bu məktəb müəyyən kişi və qadınları deyil, bütünlüklə cəmiyyəti yetişdirən bir məktəb idi. Elə həmin səbəbdən də pis mühitə qarışmayan çoban bir qadın belə, bu əqidəni bilirdi. O, günümüzdə Quranı və hədisləri bildiyini iddia edən bir çox insanların heç xəbərləri belə olmayan əqidədən, Quran və hədislərə əsaslanmış sağlam etiqaddan agah idi. Hər iki mənbədə (yəni, Quran və Sünnədə) qeyd olunmasına baxmayaraq iddiaçılar yenə də Rəblərinin harada olduğunu bilmirlər.

Hal-hazırda müsəlmanlar arasında mövzu ilə bağlı belə bir aydın açıqlama yoxdur. Günümüzdə mən demirəm çoban qadına, hətta hər hansı toplum və ya təriqət başçısına belə bir sual verdikdə, o da bir çoxları kimi səhv cavab verəcəkdir. Yalnız Allahın rəhm etdiyi az bir qisim şəxs istisna olmaqla!

***Sağlam əqidəyə dəvət davamlı şəkildə aparılmalı və bu işə böyük səy göstərilməlidir.***

Beləliklə, tövhidi təbliğ etmək və onu insanların qəlblərində yerləşdirmək üçün biz ayələri, Peyğəmbərin *(ona Allah salavatı və salamı olsun)* dövründə olduğu kimi, yəni onların təfsilatına vararaq oxumalıyıq. Birincisi əshabələr ərəb dilindəki ifadələri asanlıqla anlayırdılar. Ikincisi isə, onların əqidələri sağlam etiqada zidd olan fəlsəfə və kəlam təhriflərindən uzaq idi. Bizim bugünkü halımız ilk müsəlmanların halından təmamilə fərqlidir. Bu gün sağlam əqidəyə dəvət etməyin o dövrdəki kimi asan olduğunu təsəvvür etməyimiz doğru olmazdı. İstərdim inşallah iki nəfərin mübahisəsiz qəbul etdiyi bir misalla söylədiklərimə aydınlıq gətirim.

Məlumdur ki, Peyğəmbərin *(ona Allahın salavatı və salamı olsun)* dövründə əshabələr hədisi bir başa onun özündən, tabeinlər (yəni, əshabələrdən sonra gələn nəsil) isə, bir başa əshabədən eşidirdi. Beləcə də biz hamının etiraf etdiyi ən xeyirli əsrlər üzərində dayanaraq sual veririk: Həmin dövrdə "Hədis elmi" deyilən bir elm olmuşdurmu? Cavab olaraq deyiləcək: Xeyir. Yenə də sual versək ki: Həmin vaxt "Rəvayətçilərin tənqidi və tərifi" adlı elmi sahə var idimi? - təkrarən xeyir cavabını alacağıq.

Bu gün isə, yuxarıda adı çəkilən hər iki elmi sahəni mənimsəmək fərzü-kifayə[1] əməllərdən sayılır. Yəni, təhsil alan hər bir tələbənin onları bilməsi zəruridir. Çünki məhz bu yolla günümüzdə yaşayan alim, hədisin səhih və ya zəifliyini müəyyənləşdirə bilər.

Günümüzdə bu iş, səhabə üçün rahat olduğu qədər asan deyildir. Belə ki, o, hədisi izzət və cəlal sahibi Allahın təriflədiyi digər əshabələrdən qəbul edirdi. Həmin dövrdə elmin saflığı və onun ötürücülərinin mötəbərliyi nəticəsində asan görülən işlər hal-hazırda çox çətin həyata keçirilir. Bütün bunları nəzərə alaraq biz, ilk əsrlərdə yaşayan müsəlmanların qarşılaşmadığı, bu gün isə, yanlış əqidələrin səbəbi ilə meydana çıxmış və hamımızı öz ağuşuna almış problemləri düzgün şəkildə təhlil etməli və onlara qarşı lazımi tədbirlər görməliyik. Belə problemləri əmələ gətirən amillərdən biri də doğru əqidədən və həqiqi təbliğ metodikasından çox-çox uzaq olan bidətçilərin[2] müxtəlif adlarla, məsələn yalnız Quran və Sünnəyə dəvət adı ilə ortaya atdıqları şübhələrdir. Halbuki bu dəvəti hətta kəlam elminə əsaslanan şəxslər belə iddia edirlər.

[1] Bir qisim müsəlmanın yerinə yetirməsi ilə vacibliyi digərlərinin üzərindən düşən əməl.
[2] Dinə yeniliklər gətirmişlərin

Burada məsələ ilə bağlı bəzi səhih hədisləri qeyd etmək istərdim. Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun*) qəriblər[1] haqda buyuraraq demişdir: "***Onlardan birinə əlli nəfərin savabı var***". Ondan: "***Ey Allahın Elçisi, bizlərdən əlli nəfərin, yoxsa onlardan?***" – deyə soruşduqda, O: "***Sizlərdən***" - buyurmuşdur[2].

Bütün bu problemlər günümüzdə insanların İslam dininə qərib baxışlarından (və ya ondan çox uzaq düşmələrindən) irəli gəlir. Halbuki ilk vaxtlarda belə çətinliklər yox idi. Şübhəsiz ki, həmin dövrdə açıq-aydın şirkdən saf tövhidə, aşkar bir küfrdən düzgün imana keçid qəriblik kimi qiymətləndirilirdi. Günümüzdə isə problemlər müsəlmanların öz aralarındadır. Əksər müsəlmanların tövhidə dair etiqadı nöqsanlarla doludur. İbadəti Allahdan başqasına yönəldən şəxs belə özünün iman əhli olduğunu iddia edir. Ona görə də hər şeydən öncə bu məsələyə diqqət yetirmək lazımdır. Bundan sonra, bəzi insanlar: "Biz, başqa bir mərhələyə keçməliyik. Bu, "tövhidə çağırış" deyil, "siyasi məsələlərə keçid" mərhələsi olmalıdır - sözlərini deməməlidirlər. Çünki İslam dininə dəvət, haqq bir çağırışdır.

Bugünkü ərəblərin halı ərəbləşmiş əcəmilərin halından tam fərqlidir. Buna səbəb isə, ərəblərin öz dillərindən uzaq düşmələridir. Bu da öz növbəsində onları Rəbblərinin Kitabından və Məhəmməd peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun*) Sünnəsindən uzaq

[1] İslama düzgün riayət etdikləri üçün insanlar tərəfindən təəccüblə qarşılanan, qınanan, məzəmmət və s. edilən şəxslər

[2] Hədis səhihdir. Onu ət-Təbərani "əl-Kəbir" əsərində (10/255, hədis 10394) Abdulla ibn Məsuddan -Allah ondan razı olsun- rəvayət etmişdir. Həmçinin bu hədisi əl-Bəzzar "əz-Zəvaid" əsərində (7/282) Uqbə ibn Qəzvan adlı səhabədən -Allah ondan razı olsun- nəql etmişdir. Əbu Davud (4341) isə həmin rəvayəti Əbu Sələbədən -Allah ondan razı olsun- danışmışdır. Dahi alim Məhəmməd əl-Əlbani "Səhih hədislər silsiləsində" (494) bu hədisin səhih olduğunu bildirmişdir.

salmışdır. Bütün bunlardan sonra ərəblərin: “Biz ərəbik və Quran bizim dilimizdə nazil olmuşdur” - deməsi düzgün deyildir. Fərz edək ki, biz ərəblər, İslamı olduğu kimi anladıq. Bu halda belə bizim siyasi məsələlərə müdaxilə etməyimiz, insanların diqqətini bu sahəyə yönəltməyimiz, onları siyasi proseslərə qoşmağımız vacib sayılmır. Biz bu işlərlə müsəlmanları onlara vacib olan İslamın əqidə, ibadət, təlim-tərbiyə və qarşılıqlı münasibətlər kimi sahələrini anlamaqdan yayındırmalı deyilik. Zənnimcə sayı milyona çatan və Islamı, yəni əqidəni, ibadəti və təlim-tərbiyə məsələlərini olduğu kimi anlayan bir xalq hal-hazırda yoxdur. Allahım buna şahiddir.

***Çıxış yolu “saflaşdırma və tərbiyə etmə” prinsipinə əsaslanmaqdadır***

Həmin səbəbdən də biz həmişə düzgün çıxış yolu üçün qayda olan bu iki əsas haqda danışır və onu diqqət mərkəzində saxlayırıq. “Saflaşdırma və tərbiyə etmə”, biri-birindən ayrılmaz bir prinsipdir. Əgər bir ölkədə əqidə saflaşmasının istənilən növü varsa, bu özü-özlüyündə böyük və əzəmətli bir iş sayılır. Çünki böyük İslam ümmətinin kiçicik bir hissəsinin yəni, hər hansı xalqın bu cür əməli çox tərifəlayiqdir.

Ibadət məsələlərində isə, müəyyən məzhəbə deyil, mötəbər Sünnəyə üz tutmaq lazımdır. Düzdür, İslamı hərtərəfli şəkildə doğru anlayan alimlər mövcuddur. Lakin, zənnimcə bir, iki, ...on, iyirmi şəxs İslamın, yəni əqidənin, ibadətin, təlim-tərbiyənin və qarşılıqlı münasibətlərin "saflaşdırılması" prinsipini bərqərar edə bilməz. Az saylı bir qrupun İslam dininə yad olan əməlləri ondan təmizləməsi, ətrafında olan insanlarla düzgün təlim-tərbiyə işlərini aparması və belə bir vacib məsələni təkbaşına yerinə yetirməsi qeyri-mümkündür. Günümüzdə isə «saflaşdırma və tərbiyə etmə» prinsipinə riayət yoxdur.

Şəriətə müvafiq hökm verməyən hər hansı bir müsəlman toplumunun yuxarıda qeyd olunan iki əsası bərqərar etmədən siyasi

hərəkatlara qoşulması, mütləq özünün pis nəticələrini göstərəcəkdir. Şəriətə uyğun hökm verən ölkələrə gəldikdə isə, belə məmləkətlərdə zorakılığa yol vermədən və müəyyən bir mənfi xəbəri kütləvi informasiya vasitələrinə çatdırmadan müşavirə və ya şəriət qayda-qanunları çərçivəsində gözəl moizə ilə nəsihət vermək siyasi hərəkatları əvəz edir. Məlumatı (bu kimi üsullarla səlahiyyətli şəxslərə) çatdıran insan, artıq sübut və dəlilləri onlara çatdırmış və daşıdığı məsuliyyətdən azad olmuş sayılır.

Həmçinin, insanları onlara fayda verəcək əqidə və ibadətlərin, tərbiyə və qarşılıqlı münasibətlərin islahına yönəltməmiz də nəsihətdən sayılır.

Bəziləri elə düşünürlər ki, biz "saflaşdırma və tərbiyə etmə" prinsipini bütün İslam ümmətinə tətbiq etmək istəyirik. Bu bizim heç ağlımıza belə gəlməyən və yuxumuza girməyən bir şeydir. Çünki bu, həyata keçirilməsi mümkün olmayan bir fikirdir. İzzət və cəlal sahibi Allah Qurani-kərimdə buyurmuşdur: ***"Əgər Rəbbin, istəsəydi bütün insanları (****eyni dində olan****) tək bir ümmət edərdi. Onlar (****yəhudi, xaçpərəst, atəşpərəst və i. a. olmaqla dinləri barəsində****) hələ də ixtilafdadırlar."*** (Hud, 118). Onlar, İslamı olduğu kimi anlamayınca, özlərini, ailələrini və ətraflarındakı insanları bu ruhda tərbiyə etməyincə Uca Allahın bu kəlamı barələrində gerçəkləşməyəcəkdir.

***Siyasi fəaliyyətlə kim və nə zaman məşğul olmalıdır?***

Bugün siyasətə qoşulmaq adi bir məşğuliyyət növünə çevrilmişdir. Biz bu sözlərimizlə siyasi fəaliyyəti inkar etmirik. Sadəcə ilk öncə əqidədən, sonra ibadətdən, daha sonra isə təlim-tərbiyədən başlayan şəriətin məntiqi ardıcıllığına iman gətiririk. Bu silsilə ilə irəlilədikdən sonra günlərin bir günü biz də şəriətdən qidalanmış düşüncələrimizlə siyasi mərhələyə qədəm qoyacağıq. Belə ki, siyasət, ümmətlə bağlı işlərin idarəçiliyi mənasını daşıyır. Bu işləri

hər hansı bir partiya qurucusu və ya hərəkat rəhbəri idarə etmir. O, müsəlmanların sədaqət andı içdiyi əmr sahibinə məxsus bir sahədir. Məhz, həmin şəxs günümüzün siyasətini və onun idarəçiliyini bilməlidir. Əgər müsəlmanlar arasında vəhdət olmazsa, necə ki, bunu günümüzdə müşahidə edirik, hər bir əmr sahibi üzərinə götürdüyü öhdəçiliyi öz ərazi hüdudlarında həyata keçirməlidir. Vaxtımızı dürüst şəkildə bildiyimizi fərz etdiyimiz işlərə sərf etməyimiz isə, bizə heç bir fayda gətirməyəcəkdir. Çünki biz, həqiqətdə bu işlərin (Quran və Sünnə işığında) necə idarə ediləcəyini bilmirik. Həmçinin bizim, ümməti idarə etməyə səlahiyyətimiz çatmır. Ona görə də əbəs yerə bu işi önə çəkməyək. Misal olaraq İslam ölkələrinin bir çoxunda müsəlmanlara qarşı aparılan amansız müharibələri qeyd etmək istərdim. Əgər sədaqət andı içilərək rəhbər seçilmiş başçının idarəçiliyi ilə vacib sayılan bir Cihad (Allah yolunda döyüş) yoxdursa, müsəlmanları bu işə təşviq etməyin nə faydası var? Əlbəttə ki, bunun heç bir faydası yoxdur. Biz bu sözlərimizlə cihadın vacibliyini inkar etmirik! Biz, bu təşviqin vaxtından əvvəl atılan addım olduğunu deyirik. Ona görə də biz, həm özümüzü, həm də dəvət etdiyimiz şəxsləri İslamı doğru şəkildə anlamağa və düzgün tərbiyə almağa yönəltməliyik.

İnsanları faydasız işlərə yönəldərək onların hissləri ilə oynamaq isə, hər bir müsəlmanı onun məsuliyyət daşıdığı bir işdən, dəvəti düzgün dərk etmə mövzusundan yayındırır. Halbuki, burada vol verilən xətalar üzrlü hesab olunmur. Bu mövzu, hər bir fərdə vacib olan etiqad, ibadət və təlim-tərbiyə kimi islahedici sahələri əhatə edir. Digər sahələrə gəlincə, onlardan bəziləri, məsələn günümüzdə "fiqh əl-vaqi" (müasir məsələlərin təhlili) adlandırılan sahə, fərzü-kifayə əməllərdən[1] sayılır. Ümumiyyətlə siyasi fəaliyyət,

[1] Bir qisim müsəlmanların yerinə yetirməsilə, vacibliyi digərlərinin üzərindən düşən əməl - red.

əmr sahiblərinə aiddir. Məhz bu şəxslər həmin sahəyə tətbiqi şəkildə müdaxilə edərək, müsbət nəticələr əldə edə bilərlər. Əlində hakimiyyət olmayan bir qrup insanın bu işə qoşulması və digərlərini də daha mühüm bir məsələdən ayıraraq buraya cəlb etməsi, həqiqətdə onları doğru bilikdən yayındırmaq deməkdir. Bu, İslam adından çıxış edən bugünkü siyasi partiya və cərəyanların fəaliyyət metodunda müşahidə edilən adi bir haldır. Onların bəzilərinin düzgün əqidəni, Allaha ibadəti və əxlaqi normaları öyrənmək üçün ətraflarına toplaşmış gənclərdən üz çevirməsi də bizə bəllidir. Hətta bu (dirnaqarası) dəvətçilərin bir dəstəsi siyasi hərakatlara qoşularaq Allahın hökmü ilə hökm verməyən parlamentlərin üzvü seçilməyə cəhd göstərirlər! Bu da öz növbəsində onları həlli mühüm sayılan məsələyə deyil, hal-hazırda əhəmiyyət kəsb etməyən bir məsələyə yönəldir.

Sualda qeyd olunan bu acınacaqlı vəziyyətin yaxşılaşdırılmasında müsəlmanın necə iştirak etməsi və vəzifə borcundan necə çıxması haqda bunları demək istərdim:

Hər bir müsəlmanın öz öhdəçiliyi vardır. Məsələn elə işlər var ki, başqalarına deyil, yalnız alimə vacibdir. Bu səbəbdən də yadınıza salmaq istərdim ki, izzət və cəlal sahibi Allah, Öz Kitabı ilə bizə olan nemətini tamamlamış və onu möminlər üçün bir həyat düsturu etmişdir. Onun özündə daşıdığı qayda-qanunlardan biri də Uca Allahın aşağıdakı buyruğunda öz əksini tapmışdır: ***“Əgər bilmirsinizsə, zikr əhlindən soruşun!”*** (əl-Ənbiya, 7). Bu ayədə nöqsanlardan Pak və Uca Allah İslam cəmiyyətini iki qismə: alimlərə və qeyri alimlərə bölmüşdür. O, bu insanlara fərqli işləri vacib buyurmuşdur. Alim olmayanlara alimlərdən soruşmağı, alimlərə isə onlara verilən suallara cavab verməyi vacib buyurmuşdur. Bu məntiqdən də demək olar ki, vacib sayılan məsələlər onu icra edən şəxslərdən asılı olaraq bir-birindən fərqlənir. Günümüzdə alim öz

bacarığı çərçivəsində haqqı təbliğ etməli, qeyri alim isə özünü və himayəsində olan həyat yoldaşını, övladlarını və başqalarını narahat edən məsələlər haqda soruşmalıdır. Əgər hər iki tərəf (yəni, alim və qeyri-alim) müsəlmanlar bacarıqdıqlarını edərlərsə, nicat taparlar. Çünki, Izzət və cəlal sahibi Allah buyurmuşdur: ***"Allah hər kəsi yalnız qüvvəsi yetdiyi qədər yükləyər (****bir işə mükəlləf edər****)."*** (əl-Bəqərə, 286)

Təəssüflər olsun ki, biz, tarixdə misli görünməyən fəlakətlərin müsəlmanlara üz verdiyi bir vaxtda yaşayırıq. Bu da kafirlərin müsəlmanlar üzərinə hücumlarıdır. Məşhur və səhih bir hədisdə Peyğəmbər *(ona Allah salavatı və salamı olsun)* bu kimi hadisə haqda xəbər verərək buyurmuşdur: "***Ümmətlər sizin üzərinizə yırtıcı heyvanlar şikarın üzərinə tökülüşdüyü kimi tökülüşəcəklər. Əshabələr: Ey Allahın Elçisi! Həmin gün bizim say azlığımız buna səbəb olacaq? – deyə soruşduqda, O buyurdu: Xeyir. Siz həmin gün cox olacaqsınız. Lakin sel gətirdiyi köpüklərə bənzəyəcəksiniz. Allah düşmənlərinizin qəlblərindən sizə olan xofu siləcəkdir (artıq onlar sizdən qorxmayacaqlar). Sizin qəlblərinizə isə "vahn" salacaqdır. Əshabələr dedilər: Ey Allahın Elçisi "vahn" nədir? O belə buyurdu: Dünyanı sevm ək və ölümdən qorxmaq.*** "[1]

Bu cür halda «saflaşdırma və tərbiyə etmə» prinsini əsas götürərək mübarizə aparmaq hər bir alimə vacibdir. Yəni, onlar müsəlmanlara həqiqi tövhidi öyrətməli, əqidə, ibadət və təlim-tərbiyə məsələlərini düzgün şəkildə çatdırmalıdırlar. Hamı bu işi yaşadığı ölkədə gücü çatan səviyyədə yerinə yetirməlidir. Çünki pərən-pərən düşən müsəlmanlar nə qədər ki, hal-hazırkı vəziyyətdə qalacaqlar, yəhudilərə qarşı bir cəbhədə vuruşa bilməyəcəklər. Həmçinin onları birləşdirən nə bir ölkə, nə də vahid bir səf yoxdur. Belə halda isə,

---

[1] Hədis səhihdir. Onu Əbu Davud (4297) və Əhməd (5/287) Sövbandan -Allah ondan razı olsun- rəvayət etmişdir. Əl-Əlbani "Səhih hədislər silsiləsində" (958) bu hədisin iki isnadla səhih dərəcəsinə yetişdiyini demişdir.

onlar üzərlərinə tökülüşmüş düşmənlərin qarşısını alacaq cihada qalxa bilməzlər. Lakin buna qarşı şəriətin icazə verdiyi bütün vasitələrdən gücləri çatan qədər istifadə etməlidirlər. Bu gün bizim bu işləri icra etməyə maddi imkanlarımız yoxdur. Lakin olsaydı belə, biz onu hərəkətə gətirə bilməzdik. Çünki, təəssüflər olsun ki, hal-hazırkı bir çox müsəlman ölkələrinin hakim və rəhbərləri şəriətə (İslama, dinə) müvafiq siyasət yürütmürlər. Lakin biz bu vəziyyətdə, Allahın izni ilə, az öncə qeyd etdiyim iki böyük əsası: "saflaşdırma və tərbiyə etmə" prinsiplərini həyata keçirə bilərik. İslam təbliğatçılarının dinə müvafiq siyasət yürütməyən ölkələrdə böyük əhəmiyyətli bu vacib işi həyata keçirdikləri və onun ətrafında sıx birləşdikləri gün, məhz həmin gün mən inanıram ki, Izzət və cəlal sahibi Allahın: ***"O gün möminlər sevinəcəklər. Allahın köməyi ilə."*** (ər-Rum, 4-5) kəlamı təsdiqlənmiş olacaqdır.

***Hər bir müsəlman, həyatının bütün sahələrinə Allahın hökmünü bacardığı qədər tətbiq etməlidir***

Deməli, hər bir müsəlman vacib olan bir əməli bacardığı qədər yerinə yetirməlidir. Allah hər kəsi yalnız qüvvəsi yetdiyi qədər yükləyər. Həqiqi tövhidi və ibadəti gerçəkləşdirməyin Allahın hökmü ilə hökm verməyən ölkələrdə İslam höküməti qurmaqla heç bir əlaqəsi yoxdur. Çünki, belə yerlərdə ən birinci Allahın tövhidi qurmaq hökmünü həyata keçirmək lazımdır. Təbii ki, bəzi əsrlərdə baş vermiş fitnələr anında insanın cəmiyyətdən ayrılaraq tənhalığa çəkilməsi daha məqsədəuyğun əməl hesab olunur. Belə hallarda müsəlman xəlvətə çəkilərək Rəbbinə ibadət edir. Bu yolla o, insanları öz şərindən, özünü də onların şərindən qorumuş olur. Belə bir əməl çoxsaylı hədislərdə varid olmuşdur. Baxmayaraq ki, Ibn Ömərin *(Allah ondan razı olsun)* Peyğəmbərdən *(ona Allahın salavatı və salamı olsun)* rəvayət etdiyi: ***"Insanlarla***

***ünsiyyətdə olub onların əziyyətinə səbir edən mömin, insanlarla ünsiyyətdə olmayan və əziyyətlərinə dözməyən mömindən daha xeyirlidir"***[1] hədisdə qeyd olunduğu kimi, cəmiyyətə qarışmaq əsas meyardır. Şübhəsiz ki, İslam dövləti Allahın hökmünü yer üzündə bərqərar etmək üçün bir vasitədir. Lakin o, dinin əsas məqsədi deyildir.

Bəzi təbliğatçıların təəccüb doğuracaq əməllərindən biri də, həyata keçirə bilməyəcəkləri işlərlə məşğul olub, onlara vacib və edilməsi asan olan işləri tərk etmələridir. Onlar bütün bu deyilənlərə öz nəfsləri ilə mübarizə apararaq nail ola bilərlər. Bir müsəlman təbliğatçısı öz davamçılarına belə vəsiyyət etmişdir: "Qəlblərinizdə İslam dövlətini qurun ki, torpaqlarınızda da (İslam dövləti) qurulsun".[2]

Buna baxmayaraq biz onun ardıcıllarının ona tabe olmadıqlarını və təbliğatlarının əsas hissəsini izzət və cəlal sahibi Allahın hökm məsələsində təkləşdirilməsinə, məşhur ifadə ilə desək "hakimiyyət tövhidi"nə yönəldiyini görürük. Nəinki hökmün, bütün şeylərin tək və şəriki olmayan Allaha aid olmasında heç bir şəkk şübhə yoxdur. Lakin bu təbliğatçıların bəziləri dörd məzhəbdən birinə təqlid edərək, açıq-aydın səhih hədis gəldikdə "bu rəvayət mənim məzhəbimə ziddir" – sözlərini söyləyirlər. Bəs elə isə, Allahın Sünnəyə tabeçilik hökmünü nəyə görə yerinə yetirmirlər?!

Onların bir qismi də, Allaha sufi təriqəti üzrə ibadət edirlər. Bəs Allahın tövhid haqda verdiyi hökm harada qaldı?! Onlar öz

---

[1] Hədis səhihdir. Onu Ət-Tirmizi (2507), Ibn Macə (4032), Buxari ("Ədəbul-Mufrad" kitabı, 388) və Əhməd (5/365) Peyğəmbərin (ona Allahın salavatı və salamı olsun) yaşlı bir əshabəsindən rəvayət etmişdir. Əl-Əlbani "Səhih hədislər silsiləsində" (939) bu hədisin səhih olduğunu qeyd etmişdir.

[2] Bu söz, təsis edildiyi gündən yəni, 20-ci əsrin ortalarından İslam ümmətinə ciddi zərbələr vuran "Müsəlman qardaşlar" (ərəb. İxvanul-muslimin) adlı siyasi hərəkatın təsisçilərindən biri olan Həsən Bənnaya məxsusdur.

qarşılarına qoymadıqları tələbləri başqalarının qarşısına qoyurlar. Axı siz öz əqidənizi, ibadətinizi, təlim-tərbiyənizi, evinizi, övladlarınızın tərbiyəsini və alqı-satqı işlərinizi Allahın hökmü əsasında daha asanlıqla qura bilərsiniz. Çox məsələlərdə Allahın hökmü ilə hökm verməyən hakimləri buna məcbur etmək və ya onları vəzifələrindən azad etmək heç də asan deyil, əksinə həddən artıq çətin bir işdir. Belə olduğu halda sizin asan bir işi tərk edib çətinindən yapışmağınızın nə mənası var?!

Bunun iki səbəbi:

Birincisi, bu kəslərin pis tərbiyə alması və səhv istiqamətə yönəlmələri,

Ikincisi isə, onları bacara bildikləri əməllərdən uzaqlaşdıran və gücləri çatmayan işlərə sürükləyən yanlış əqidənin təsiri ola bilər.

Fikrimcə bu gün hər bir fərd bütün gücünü insanların "saflaşdırma və tərbiyə etmə" prinsipinə, sağlam əqidəyə və düzgün ibadətə dəvət edilməsinə yönəltməlidir. Təbii ki, bu onun bacarığı çərçivəsində olmalıdır. Allah hər kəsi yalnız qüvvəsi yetdiyi qədər yükləyər.

**Həmd aləmlərin Rəbbi olan**
**Allaha məxsusdur.**
**Peyğəmbərimiz Məhəmmədə və ailəsinə Allahın salavatı və salamı olsun.**

